

6th INTERNATIONAL

# EUROASIA

## Congress on Scientific Researches and Recent Trends

May 18-20, 2020
Baku, Azerbaijan



Edited by
Prof. Dr. Gulzar IBRAHIMOVA
Dr. Təranə NAĞIYEVA

# BOOK OF FULL TEXTS

## VOLUME-I









www.baau.edu.az

www.iksad.org.tr

## YAŞMA YARIMADASININ FİZİKİ-COĞRAFİ SƏCİYYƏSİ

**Elsevər Cəlilov**
*Azərbaycan Dövlet Pedaqoji Üniversiteti*

**XÜLASƏ**

Yaşma yarımadası Azərbaycan respublikası ərazisində, Xəzər dənizinin qərb sahilində əlverişli-strateji-coğrafi mövqeydə yerləşir. Xəzər dənizində Azərbaycan Respublikasına məxsus olan ada və yarımadalar haqqında elmi məıumatların olması çox vacib məsələlərdən biridir.Amma hələki bu məlumatlar çox azdır.

Yaşma yarımadası təxminən yarım əsr bundan əvvəl ada olarkən onun sahəsi təxminən 2-3 ha idi. Lakin daha sonradan Xəzər dənizinin səviyyəsinin aşağı düşməsi nəticəsində xeyli quru sahə su altından çıxdı. Hal-hazırda Xəzər dənizinin səviyyəsinin aşağı düşməsi müşahidə olunur. Buda Yamşa yarımadasının sahəsinin artmasına gətirib çıxarır. Nəticə olaraq Yaşma adası adadan yarımadaya transformasiya olundu. Amma hələ də bəzi mənbələrdə Yaşma ada kimi yazılır, lakin indiki dövrdə Yaşma bir yarımadadır.

**Açar söz:** Ada, yarımada, dəniz, vulkan, transqresiya, reqresiya, qəsəbə, sahil, miqrasiya

Yaşma yarımadası Xızı rayonu ərazisində Şuraabad kəndindən sonra Xəzər sahili zonada mövqe tutur. Şuraabad kənd sakinlərinin dediklərinə əsasən təxminən yarım əsr bundan qabaq Yaşma yarımada deyil ada imiş və onun sahəsi təxminən 2-3 ha olmuşdur. Hal-hazırda isə Yaşma yarımadasının sahəsi əvvəlkindən daha böyükdür.. Yaşma yarımadası və Şuraabad kəndinin topaq sahəinin əsasını demək olar ki, qumluq təşkil edir.

Yaşma yarımadasını tarixi-coğrafi baxımdan iki hissəyə ayrılır:

1. Keşmişdə ada olan hissə
2. Yaxın 25-50 ildə su altından çıxmış yarımadanın cənuba davamını təşkil edən hissə

Yaşma yarımadasının cənuba davamı olan hissəsinin su altından çıxması yaxın 25-50 ildə baş vermişdir. Yerli sakinlərin sözlərinə əsasən Xəzər dənizi müəyyən müddətdən bir geri çəkilir və yenidən bunun əksi müşahidə olunur. Yaşma yarımadasının Xəzər dənizi sahilinin turizm presüpektivi olduqca böyükdür. Təsadüfü deyil ki, Yaşma yarımadasında müvəqqəti Kayt sörfinq istirahət məkzidə məhz buna görə burada yardılmışdır.

Yaşma yarımadasının cənuba davamı olan hissəsinin şərq sahili boyu 25-30 metrlik qumluq sahəsi intensiv nəm olur. Bunun səbəbi isə Xəzər dənizinin dalğalarının sahilə təsiridir. Yaşma yarımadasının şərq sahilində bataqlıqlara rast gəlinmir. Yarımadanın şərq sahili bütünlüklə Xəzər dənizi ilə əhatə olunur. Keçmişdə ada olan hissədə Xəzər dənizin göz yaşı kimi aydın suları sahilə güclü təsir göstərə bilmir. Çünki bu hissənin torpaq örtüyünün tərkibində qumla yanaşı daşlara da rast gəlinir.Bu hissədə Xəzər dənizi daşlara toxunsa da sahil relyefinin formalaşmasına güclü təsir göstərə bilmir. Uzun müddət ərzində təsir göstərməsi nəticəsində sual daşları yuyub, cilalayıb.Yaşma yarımadasının cənuba davamı olan 2 km-lik hissəsinin şərq sahili qərb sahiulə nisbətən hündürdür. Yaşma yarımadasının cənuba davamı olan 2 km-lik şərq sahilin relyefi əsasən hamardır. Yaşma yarımadasının sahil xətləri qərb sahilində girintili-çıxıntılıdır. Yarımadanın relyefi əhasən hamardır. Buna görə də Cənub ucqar nöqtədən baxdıda xeyli geniş ərazi görünür.

Yaşma yarımadasının cənuba davamı olan hissəsinin torpaq örtüyü tamamilə ( bir sıra ərazilər istisna olmaqla) qumluqdur. Yarımadanın cənuba davamının şərq sahili tamamilə qumluqdur. Şərq sahili boyunda sayı təxminən 15-ə çatan, hündürlüyü 1 m olan qum təpəcikləri vardır. Bu hissədə Xəzər dənizi qum üzərində rəsm əsərləri çəkmişdir. Yaşma yarımadasının ən hündürdə yerləşən hissəsinin su altında qalması üçün Xəzər dənizinin təxminən 1-2 m qalxması lazımdır. Həmin hissə yarımadanın cənub ucqar nöqtəsindən 4 km şimalda

yerləşir. Yaşma yarımadasının cənuba davamı olan hissənin sahəsi 2 km kvadratdır. Yarımadanının şərq 4 km-lik hissəsini Xəzər dənizin suları intensiv yuyur.

Yaşma yarımadasının bitki örtüyü olduqca kasıbdır. Yarımadanın torpaq örtüyü qumluq olduğundan burada qumda bitən bitkilərin bir neçəsi bitir. Yarımadada azda olsa ağac növünə rast gəlinir. Burada ağac növləri barmaqla sayılacaq qədərdir. Burada 10 ədəd cır iydə ağacı vardır ki, onların 3-ü hündür, digərləri isə alçaqboyludur. Yarımadanın cənuba davamında olan cır iydə ağacları onun mərkəz və şimal hissəsindədir. Yarımadanın cənub hissəsi isə azsaylı ot bitkiləri ilə örtülüdür. Cənub ucqar nöqtəsi isə bitki örtüyündən məhrumdur. Və bu hissə ilə Xəzər dənizinin suları arasında olan məsafə 1-2 sm-dir. Buradan məlum olur ki, Xəzər dənizinin suları Yarımadanın cənub ucqar nöqtəsinə müəyyən vaxtdan bir təsir göstərir və bu hissə su altında qalır. Xəzər dənizində baş verən transqresiya və reqresiya nəticəsində cənub və cənub-qərb hissə gah su altında qalır gah da quruya çevrilir.

Yaşma yarımadasının cənub ucqar nöqtəsinin eni 6 m-dir. Yarımadanın ən ensiz yeri cənub ucqar nöqtədən 5 m şimaldadır. Bu hissənin eni 3 metrdir. Cənub ucaq nöqtədə güclü əsən Xəzri küləyinində təsiri ilə Xəzər dənizi yarımadanın 10 m içərisinə girmiş və burada çox dayaz olan körfər əmələ gətirmişdir. Qeyd edək ki, Yaşma yarımadasının cənuba davamının qərb sahilində bir neçə körfəzciklər vardır. Onların ən böyüyü cənub ucqar nöqtədən 1 km şimalda yerləşir. Yaşma yarımadasının cənuba davamının qərb sahilində Xəzər dənizin təsii ilə yarımadadan ayrılmış kiçik quru parçaları vardır ki, onların sayı 5-ə yaxındır. Bu hissədə Köçəri quşlar dincəlir. Yaşma yarımadasının qərb sahili şərq sahilə nisbətən daha alçaqdır. Yəni Xəzər dənizinin səviyyəsi qalxarkən ilk qərb sahil su altında qalır.Xəzər dənizində qabarma-çəkilmə olarkən su daha çox qərb sahilə təsir göstərir. Və təxminən eni 25-30 m, uzunluğu 2 km-dən artıq olan sahil zolağı su altında qalır.Xəzər dənizində qabarma mart ayının 15-ində saat 15-16:00 radələrində baş vermişdir. Qeyd edək ki, qabarma-çəkilmə hadisələri baş verən günlər arasında 50-60 dəq və daha fərqli zaman fırqi olur. Qərb sahilin daha çox girntili-çıxıntılı olma səbəblərindən bir isə buradan əsən güclü küləklərdir. Yarımadanın Xəzər dənizinin sularından azad olan qərb sahili hələ də bataqlıqdır. Hətda geniş qumluq sahədə bataqlılqlar əmələ gəlmiş və kiçik gölməçələr formalaşdmışdır. Yaşma hələ yarımada olmazdan əvvəl ada olarkən burada palçıq vulkanları olduğu deyilir. Elə indidə burada Qobustan-Abşeron zonası palçıq vulkanlarından heç də geri qalmayan 10-a yaxın irili-xırdalı palçıq vulkanı vardır.

Palçıq vulkanı təbiətin yaratdığı maraqlı təbiət abidələrindən biridir. Palçıq vulkanları əsasən neftli-qazlı sahələrdə çıxır. Dünyada olan palçıq vulkanlarının 200-dən çoxu Azərbaycan respublikasındadır. Bu yaxınlara qədər palçıq vulkanları qorunmur və insanları müəyyən məqsədlərinə görə məhv edilir və onların yerində evlər tikilirdi. Daha sonradan isə Azərbaycan Respublikası prezidentinin sərəncamıyla palçıq vulkanları xüsusi qorunmağa başlanmışdı. Abşeronda olan 57 palçıq vulkanı Ekologiya və Təbii Sərvətlər Nazirliyi tərəfindən qorunur.

Şuraabad kənd sakinlərinin dediklərinə görə vaxtilə burtadan xeyli neft daşınıb. Bu da burada olan palçıq vulkanlarılnın varlığılna bir isbatdır. Burada olan palçıq vulkanlarının 4-ü bir xətt üzərinə yerləşir. Palçıq vulkanlıarının dərinliyi 5 km-ə qədər olur. Bu palçıq vulkanlarından 3-ü kiçik və zəyif partlayışlı, digər 4-ücüsü isə digər 3 palçıq vulkanına nisbətən böyük və güclü partlayışlıdır. Bu palçıq vulkanının hündürlüyü 30 sm, diametdi 20 sm-ə bərabərdir. Palçıq vulkanı püskürdükdən sonra onun "lavası" 5 m-lik sahəni əhatə etmişdir.

Bu 4 palçıq vulkanından 2.70 km uzaqda buranın ən böyük palçıq vulkanları yerləşir. Burada iki böyük palçıq vulkanı və onların kiçik vulkancıqları vardır. Bu iki palçıq vulkanı arasında olan məsafə 200 m-dir.



***Şəkil 1. Yaşma yarımadasının palçıq vulkanı***

Yarımadada olan ən böyük palçıq vulkanı tarixən ada olan ərazidədir. Onun hündürlüyü təxminən 1 m, diametri 1 m-ə yaxındır. Ümumiyyətlə bu palçıq vulkanı və onun yanındakı digər vulkanların sahəsi birgə 320,10 m -dir. Digər palçıq vulkanı isə ölçülərinə görə bu palçıq vulkanından kiçikdir. Qeyd edək ki, bu biki böyük palçıq vulkanı Yaşma yarımadasının qərb sahilində yerləşir.

Əgər Xəzər dənizin səviyyəsi 10 sm qalxarsa Yaşma yarımadasının cənuba davmının qərb sahili bütünlüklə, şərq sahilində isə təxminən 100-lik hissə Xəzər suları altında qalcaq. Xəzər dəniznin səviyyəsinin 1-2 metr qalması isə Yaşma yarımadasının təkrar yaşma adasına çevrilməsinə səbəb ola bilər.



***Şəkil 2. Yaşma yarımadasının cənub ucqar nöqtəsi (40,753 şm en, 49,526 ş u)***

Yaşma yarımadasının cənuba davamının qərb ucqar nöqtəsində Xəzər dəninin ən dar və dayaz olan hissəsi nəzərə çarpır. Bu hissədə Xəzər dənizi lal axan çaya bənzəyir. Xəzər dənin eni burada 25-30 m-dir.

Yaşma yarımadasının qərb ucaq nöqtəsi 40.763003 şm e, 49.531403 ş u

Yaşma yarımadasının tranzit əhəmiyyəti də böyükdür. Şimal bölgəsindən köç edən köçəri quşların əsas nəqliyyat dəhlizi Yaşma yarımadasınln üzərindən keçir. Demık olar ki,şimal bölgəsindən (Rusiya və s) cənub bölgəsinə "miqrasiya" edən bütün növ köçəri quşlar buradan keçir. Quşlardan qaz (ağ qaz, boz qaz, qızıl qaz), qu quşu (fısıldayan, fit çalan), ördək,qaşqaldaq, cüllütün əksər növləri buradan cənub bölgəsinə uçub gedirlər. Həmçinin Yaşma yarımadasında əsasən qərb sahilində yerləşən körfəzciklərdə dincəlirlər. Yaşma ərazisində Azərbaycan Respublikası Ekologiya və Təbii Sərvətlər Nazirliyinin nəzarəti altında fəaliyyət göstərən mövsümi Yaşma ovçuluq təsərüfatı (Ministry of Ecology and Natural Resources of Azerbaijan Respublic Yashma-Huntinc Place) fəaliyyət göstərir. ETSN-nin ovçuluq təsərüfatının müfətdişinin sözlərinə əsasən yarımadada sürünənlərdən su ilanı, gürzə və digər ilanlar olur. Yay aylarında yarımada sürünənlər üçün unikal şəraitli mərkəzə çevrilir. Yarımada ərazisinin qumluq və Xəzər sahili mövqeydə olması əsasən su ilanları üçün əlverişli şərait yaradır.Yarımadadan kənarda Şuraabad kənd sakinlərinin adlandırdığı at ilanı kimi tanınan sürünən, qırmızı ilan, koramal məskunlaşır.

***Nəticə***: Mavi Xəzərin üzərində şəfıq saçan günəş şüaları ecaskar mənzərə yaradır. Xəzər dənuzinin Yaşma yarımadası sahili ekoloji cəhətdən təmizdir. Bir tərəfdən Xəzər dənizi, bir tərəfdən Xızı dağları, digər tərəfdən Yaşma yarımadasının göz oxşadıqca uzanan ərazisi bir sözlə ecaskardır. Xəzərin Yaşma yarımadası sahillərinin turizm prespektivi olduqca böyükdür. Gələcəkdə burada mövsümi turizm mərkəzlərinin açılması məqsədəuyğundur.

**Ədəbiyyat:**

1. M.A.Müseyibov. Azərbaycanın fiziki coğrafiyası. "Maarif nəşriyyatı" Bakı-1998
2. İ.S.Quliyev, A.Əliyev, Ə.Ə.Feyzullayev . Palçıq vulkanları haqqında nə bilirik? Bakı-2012